*Həyat elmləri və biotibb jurnalı, cild 74, №2, səh. 5-12 (2019)*

# Atom yerdəyişmə parametrlərindən istifadə etməklə Zülalların Verilənlər Bazasında olan quruluşların yoxlanılması

**R.Ç. Məsməliyeva**

*AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu, İzzət Nəbiyev, 11, Bakı AZ1073, Azərbaycan;*
*E-mail: r.masmaliyeva@imbb.science.az*
Çapa qəbul edilmişdir: 28.12.2019

**Hal-hazırda Zülalların Verilənlər Bazasında (ZVB) 156 mindən çox makromolekulyar quruluş vardır. Əgər ZVB yaradılandan sonra ilk dövrlərdə mümkün qədər çox quruluşların alınması prioritet idisə, indi əsas məqsəd müxtəlif bioloji prosesləri başa düşmək üçün məqsədə uyğun olan molekulların quruluşlarının öyrənilməsidir. Bu isə molekulların üçölçülü quruluşlarının yoxlanılması və yaxşılaşdırılması probleminin əhəmiyyətini daha da artırır. Yeni yoxlama metodlarının yaradılması və inkişaf etdirilməsi vacibdir. Klassik yoxlama metodları zülal molekullarının fiziki və kimyəvi xüsusiyyətlərini, amin turşuların həndəsəsini nəzərə alır. Tədqiqatlarımızda göstəririk ki, atom yerdəyişmə parametrləri (AYP) də bu məqsədlə istifadə oluna bilər. AYP atomun öz pozisiyasından yerini dəyişməsini ifadə edir. Onların statistik modelinin inkişaf etdirilməsi makromolekulyar quruluşların yoxlanılması və yaxşılaşdırılması üçün əhəmiyyətli vasitə ola bilər. Bu məqalə temperatur faktorunun statistik analizinin bütün ZVB-yə tətbiqinə və sözügedən yoxlama metodunun məlum quruluşların yaxşılaşdırılması üçün mümkün istifədəsinə həsr olunmuşdur.**

***Açar sözlər:*** *Atom yerdəyişmə parametrləri, makromolekulyar saflaşdırma, validasiya*

## GİRİŞ

Hal-hazırda Zülalların Verilənlər Bazasında 156 mindən çox quruluş vardır və hər il bu bazaya təxminən 10 min yeni quruluş əlavə olunur. (Berman et al., 2002). Əgər ZVB yaradılandan sonra ilk dövrlərdə prioritet mümkün qədər çox quruluşların alınması idisə, indi, əsas məqsəd konkret quruluşların öyrənilməsidir. Bu isə molekulların üçölçülü quruluşlarının yoxlanılması və yaxşılaşdırılması probleminin əhəmiyyətini daha da artırır. Əvvəlki məqaləmiz (Masmaliyeva and Murshudov, 2019) atom yerdəyişmə parametrlərindən (AYP) (Trueblood et al., 1996) biri olan izotropik temperatur faktorunun (və ya B faktor) statistik analizinin makromolekulyar quruluşlarının yoxlanılması üçün istifadəsində əhəmiyyətinə həsr edilmişdir. Zülal quruluşlarının yoxlanılmasına həsr olunan məqalələr çox olsa da, AYP-nin analizi cəmi bir neçə tədqiqat işində əks olunmuşdur (Dauter et al., 2006; Merritt, 2011, Read, 2011; Schneider, 2014, Carugo, 2018; Grosse-Kunstleve, 2002). Adətən molekulyar quruluşların yoxlanılması üçün atomun nisbi pozisiyasından istifadə olunur. AYP-i atomların pozisiyalarının dəqiqliyini ifadə etdiyindən, onlardan da quruluş modellərinin yoxlnılmasında istifadə etmək məqsədyönlüdür. AYP-i quruluş modellərinin vacib hissəsi olub, atomların öz pozisiyasından yayınmasını ifadə edir. B faktorun saflaşdırılması eksperimental verilənlər və model arasındakı uyğunluğu yüksəldir. Temperatur faktorunun mütləq qiyməti ilə problem ondadır ki, onun bütün qiymətlərinə eyni bir ədədi əlavə etsək/çıxsaq, orta qiymət uyğun olaraq dəyişəcək, lakin varians dəyişmir. Elektron paylanmalarının Fürye analizindən məlumdur ki, makromolekulyar quruluşların təsvirlərinin həddən artıq kəskinkəşdirilməsi və ya yayılması mənasızdır: Fürye sıralarının kəsilməsi effekti həddən artıq çox olduqda küyün qiyməti güclənərək siqnalın görünməsinə imkan verməyəcək. Ona görə də bu hallar arzuedilməz hesab olunur. Bu da saflaşdırma alqoritmlərində B qiymətlərinə əsaslanan məhdudlaşdırmaların tətbiqində əlverişsizdir. Bu səbəbdən də B faktorun paylanmasından istifadə etmək daha məqsədəuyğundur. İzotropik temperatur faktorunun paylanması Sürüşən tərs qamma paylanmasına uyğun gəlir (Masmaliyeva and

Murshudov, 2019). Bu paylanmanın parametrlərinin qiymətləndirilməsi və qrafik təsviri zülal molekullarının üçölçülü modellərindəki səhvlərin aşkarlanmasına imkan verir. Bu məqalə temperatur faktorunun statistik analizinin bütün ZVB-yə tətbiqinə və hazırlanmış yoxlama metodunun məlum quruluşların yoxlanılması üçün mümkün istifədəsinə həsr olunub.

## MATERİAL VƏ METODLAR

ZVB-dakı quruluşlar yüklənmiş və Refmac (Murshudov et al., 2011) proqramı ilə yenidən saflaşdırılma aparılmışdır. R faktorun (Morris et al., 1992) qiyməti 0.30 və yuxarı olan quruluşlar analizlərdən kənarlaşdırılmışdır. Belə ki, bu quruluşlarda model və eksperimental verilənlərin uyğunluğu zəifdir. Yenidən saflaşdırma verilənlərin obyektivliyi baxımından vacibdir. Çünkü, baxmayaraq ki ZVB-dakı quruluşların bir hissəsi Refmac proqramı ilə saflaşdırılsa da, digər proqramlarla saflaşdırılan quruluşlar da vardır. Təcrübə göstərir ki, müasir üsullardan istifadə edərək yenidən saflaşdırma verilənlərin yoxlanılmasından düzgün nəticə almaq üçün zəruri prosedurdur.

Sürüşən tərs qamma paylanmasının parametrləri bunlardır: forma parametri (α), miqyas parametri (β) və sürüşmə addımı parametri ($B_0$):

$$\boldsymbol{P(B; B_0; \alpha; \beta) = \frac{\beta^{\alpha}}{\Gamma(\alpha)}(B - B_0)^{-\alpha-1} exp\left(\frac{-\beta}{B-B_0}\right)} \quad \textbf{(1)}$$

İlk iki momentdən istifadə etməklə (momentlər üsulu) parametrlərdən ikisini hesablamaq olar (Stuart et al., 1999):

$$\boldsymbol{\langle B - B_0\rangle = \frac{\beta}{\alpha - 1}}$$

$$\boldsymbol{var(B - B_0) = var(B) = \frac{\beta^2}{(\alpha-1)^2(\alpha-2)}} \quad \textbf{(2)}$$

Üçüncü parametri isə ya üçüncü momentdən və ya minimum B faktordan istifadə edərək tapmaq olar. Alınan parameterlər sonra Maksimal mümkünlük metodu ilə daha da yaxşılaşdırılır.

Atom yerdəyişmə parametrlərinin paylanmasını Sürüşən tərs qamma paylanması ilə modelləşdirdikdən və bütün ZVB üçün parametrləmə apardıqdan sonra *R* statistika paketinin (R core team, 2014) köməyi ilə Proqnozlaşdırma intervalı hesablanmışdır. Bu intervaldan kənar qiymətlər göstərən quruluşlar daha dərindən nəzərdən keçirilməlidir. Proqnozlaşdırma intervalı reqressiya analizində proqnozlaşdırma üçün istifadə olunan Etibarlılıq intervalı növüdür (Stuart et al., 1999). Bu elə qiymətlər parçasıdır ki, bu, verilən modelə uyğun yeni müşahidələrin proqnozlanmasına imkan verir. Proqnozlaşdırma intervalının Etibarlılıq intervalından əsas fərqi odur ki, Etibalılıq intervalı çoxluğun öz parametrləri ilə əlaqədar olduğu halda, Proqnozlaşdırma intervalı gələcək müşahidələrin qiymətlərinin düşəcəyi parçanı ifadə edir.

Bu parametrlərin hesablanması və B faktorun paylanmasının qrafiki təsvirinin qurulması üçün ToBvalid.py proqram təminatı inkişaf etdirilmiş və istifadə edilmişdir (Masmaliyeva and Murshudov, 2019). Eləcə də, Sürüşən tərs qamma paylanmasının ümumi statistikası aparılmışdır: minimal qiymət, maksimal qiymət, orta qiymət, median, varians, meyillilik, kurtozis, 1-ci kvartil, 3-cü kvartil. Kənaraçıxmaların aradan qaldırılması üçün İnterkvartil məsafələr və ya Tukey metodundan (Tukey et al., 1977; McGill, 1978, Masmaliyeva and Murshudov, 2018) və Tərs qamma üçün Kvantaillər funksiyasından (Jones et al., 2019) istifadə olunmuşdur. Tukey metodunda əmsal 3 istifadə edilmişdir. Bu əmsal temperatur faktorunun paylanmasında kənaraçıxmaların aradan qaldırılması üçün daha əlverişlidir (Masmaliyeva and Murshudov, 2018). Kvantaillar funksiyasında persentil nöqtələri 0.05 və 0.95 seçilmişdir. Qeyd etmək lazımdır ki, Tərs qamma paylanması sağ meyillilikli asimmetrik paylanma olduğuna görə Tukey metodu əksər hallarda ancaq sağ kənaraçıxmaları müəyyən edir. Lakin aşırı yayılmanı ifadə edən böyük qiymətlərlə yanaşı, B faktorun öz mühitindən kəskin fərqlənən çox kiçik qiyməylərini müəyyən etmək yanlış yerləşdirilmiş və ya ağır atomların müəyyənləşdirilməsində əhəmiyyət kəsb edir. Python *SciPy.stats* (Jones et al., 2019) kitabxamasının *invgamma* funksiyasının kvantaillar metodu bu kənaraçıxmaları da müəyyən etəməyə imkan verir və Tərs qamma paylanmasının xüsusiyyətlərini nəzərə alır.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

***α forma parametrinin proqnozlaşdırma intervalı.*** Atom yerdəyişmə parametrlərinin Sürüşən tərs qamma paylanması modelini bütün ZVB-yə

tətbiq edəndən sonra ZVB-dəki quruluşların əksəriyyətinin bu modelə uyğun gəldiyi məlum olmuşdur. ZVB-dəki bütün quruluşların α parametrlərindən istifadə etməklə Proqnozlaşdırma intervalı hesablanmışdır (Şəkil 1). Tənlik 2-dən görünür ki, yalnız α parametrinin qiyməti 1-dən böyük olduğu halda 1-ci momentin və 2-dən böyük olduğu halda 2-ci momentin mənası vardır. Proqnozlaşdırma intervalının qrafik təsvirindən görünür ki, bu, zülal quruluşları üçün doğrudur.




**Şəkil 1.** α parametrinin ayırdetməyə görə Proqnozlaşdırma intervalı.

***Saflaşdırma metodunun seçilməsi.*** B faktorun paylanmasının Sürüşən tərs qamma paylanmasından istifadə etməklə modelləşdirilməsinin saflaşdırma metodunun seçilməsində də əhəmiyyətli rolu vardır. α və β parametrlərinin çox böyük qiymətləri, xüsusilə də α parametrinin Proqnozlaşdırma intervalı xaricindəki qiymətləri tətbiq edilən saflaşdırma prosesinin qeyri-optimal olmasının nəticəsində meydana çıxa bilər. Bu halda yenidən saflaşdırmanın tətbiq edilməsi zəruridir. Buna misal ola bilən quruluşlardan biri ZVB-də 1OB1 identifikatorlu quruluş olan Fab kompleksin kristal strukturudur (Pizzaro et al., 2003). Qeyd etmək lazımdır ki, bu kompleks *Plasmodium falciparum*-dan alınmış və malyariya xəstəliyi vaksininin hazırlanmasında istifadə edilmək üçün namizəddir. Şəkil 2-də 1OB1 quruluşunun yenidən saflaşdırmadan əvvəl (A) və sükuta görə yenidən saflaşdırmadan sonra (B) temperatur faktorunun paylanmasının histoqramı və Sürüşən tərs qamma paylanması təsvir edilmişdir.

Şəkil 2-dən göründüyü kimi, bu paylanmalar

Tərs qamma paylanmasına uyğun gəlmir, və α parametri Proqnozlaşdırma intervalına uyğun deyildir. Yenidən saflaşdırmanın dövrlərinin sayını 20 (sükuta görə Refmac proqramında 5 dövr təyin edlib) təyin etdikdən və yayılma (25 Å) tətbiq edəndən sonra, B faktorun paylanması Tərs qammaya uyğun gəlir, α parametrinin qiyməti Proqnozlaşdırma intervalına daxil olur və həmçinin R faktorun qiyməti aşağı düşür (Şəkil 3, Cədvəl 1).




**Şəkil 2.** 1OB1 quruluşunun yenidən saflaşdırmadan əvvəl (A) və sükuta görə yenidən saflaşdırmadan sonra (B) temperatur faktorunun paylanmasının histoqramı və Sürüşən tərs qamma paylanması.

**Cədvəl 1.** 1OB1 quruluşunun B faktor paylanmasının tərs qamma parametrlərinə saflaşdırma üsulunun təsiri.

| | **α** | **β** | **R faktor** |
|---|---|---|---|
| **ZVB-dən yüklənmiş quruluş** | 7.59 | 58.44 | 0.258[1] |
| **Standart yenidən saflaşdırma** | 5.03 | 321.14 | 0.28041 |
| **Sonrakı yenidən saflaşdırma** | 4.2 | 354.86 | 0.22507 |

[1]R faktorun ZVB-də verilmiş qiyməti




**Şəkil 3.** 1OB1 quruluşunun istifadəçi tərəfindən müəyyən edilən yenidən saflaşdırmadan (20 dövr yenidən saflaşdırma və 25 Å yayılma) sonra temperatur faktorunun paylanmasının histoqramı və Sürüşən tərs qamma paylanması.




**Şəkil 4.** 1AOW quruluşunun yenidən saflaşdırmadan əvvəl (A) və sükuta görə yenidən saflaşdırmadan sonra (B) temperatur faktorunun paylanmasının histoqramı və Sürüşən tərs qamma paylanması.

***Aşırı kəskinləşdirilmiş hal.*** Verilmiş paylanmada B faktorun minimal qiymətlərinin tezliyi yuxarı olduqda paylanma sola sürüşmüş olarsa, demək bu quruluş saflaşdırmadan qabaq aşırı kəskinləşdirilmişdir. Belə halda Sürüşən tərs qamma paylanmasının parametrləri qeyri-tipik qiymətlər alır: $B_0$ sürüşmə addımı parametri sıfra yaxınlaşır və hətta mənfi qiymətlər də ala bilir, α parametri proqnozlaşdırma intervalının aşağı sərhəddindən kiçik olur. Bütün ZVB-dəki quruluşlardan 3252 ədəd $B_0 \leq 0$ halı vardır. Ümumilikdə ZVB-də 5868 aşırı kəskinləşdirilmiş quruluş müəyyən edilmişdir. Bu quruluşlara aid nümunələrdən biri ZVB-də 1AOW identifikatorlu kalsium/fosfolipid birləşdirici zülal olan Anneksin IV-ün quruluşudur. Burada B faktorun minimal qiyməti və ona yaxın qiymətlərin yüksək tezliyini və paylanmanın sola sürüşmüş histoqramını müşahidə etmək olar (Şəkil 4). Yenidən saflaşdırma zamanı yayılma (25 Å) tətbiq edəndən sonra B faktorun paylanması Sürüşən tərs qamma paylanmasına uyğun gəlir (Şəkil 5, Cədvəl 2).

**Cədvəl 2.** 1AOW quruluşunun B faktor paylanmasının tərs qamma parametrlərinə saflaşdırma üsulunun təsiri

| | α | β | $B_0$ | R faktor |
|---|---|---|---|---|
| **ZVB-dən yüklənmiş quruluş** | 3.59 | 79.91 | -9.21 | 0.19[2] |
| **Standart yenidən saflaşdırma** | 1.29 | 2.91 | -0.19 | 0.24 |
| **Sonrakı yenidən saflaşdırma** | 3.73 | 59.85 | 8.81 | 0.23 |

[2]R faktorun ZVB-də verilmiş qiyməti




**Şəkil 5.** 1AOW quruluşunun istifadəçi tərəfindən müəyyən edilən (25 Å yayılma) yenidən saflaşdırmadan sonra temperatur faktorunun paylanmasının histoqramı və Sürüşən tərs qamma paylanması.

***Sürüşən tərs qamma paylanmasında sol quyruq müşahidə edilən hal.*** Tərs qamma paylanması müsbət asimmetriyalı, sağ quyruqlu müsbət ehtimal paylanmasıdır. Temperatur faktorunun Sürüşən tərs qamma paylanması kimi modelləşdirilməsi alqoritmini ZVB-dəki bütün zülal quruluşlara tətbiq etdikdən sonra müəyyən edilmişdir ki, 1469 quruluşda B faktorun paylanmasında sol quyruq müşahidə olunur. Ümumiyyətlə bu hal onu göstərir ki, quruluş modelində yanlış modelləşdirilmiş atomlar və ya ağır atomlar ola bilər. Bu hala aid bir nümunəni ZVB-də 1ZNZ identifikatorlu QTF ilə kompleksdə Quanilat kinazanın (Hible, 2005) üçölçülü quruluş modelinin misalında nəzərdən keçirək. Sol quyruqluluq halının meydana çıxması ona gətirib çıxarır ki, histoqram və tərs qamma paylanması bir-birinə uyğun gəlmir və bu kənaraçıxmaların ehtimal paylanmasına təsiri nəticəsində hesablanmış parametrlər B faktorun paylanmasına tam uyğun gəlməyə bilər (Şəkil 6 A). Tərs qamma üçün kvantaillar metodundan istifadə etməklə sol quyruqluluq əmələ gətirən kənaraçıxmaları müəyyən etmək olar. Bu kənaraçıxmalar aradan qaldırıldıqdan sonra B faktorun histoqramı və hesablanan parametrlər uyğun tərs qamma paylanması üst-üstə düşür (Şəkil 6 B).




**Şəkil 6.** Bir ZNZ identifikatorlu zülalın quruluş modelində B faktorun paylanmasından sol quyruqluluq əmələ gətirən kənaraçıxmaları aradan qaldırmazdan əvvəl (A) və aradan qaldırdıqdan sonra (B) Sürüşən tərs qamma paylanmasının necə dəyişdiyinin təsviri.

**Cədvəl 3.** Bir ZNZ quruluşunun B faktor paylanmasının parametrlərinə kənaraçıxmaların aradan qaldırılmasının təsiri.

| | α | β | $B_0$ |
|---|---|---|---|
| **Kənaraçıxmalar ilə birlikdə** | 4.64 | 145.21 | 0.68 |
| **Kənaraçıxmalar aradan qaldırıldıqdan sonra** | 3.85 | 50.16 | 17.64 |

Parametrlərin necə dəyişməsi Cədvəl 3-də verilmişdir.

Beləliklə, atom yerdəyişmə parametrlərinin statistik modeli zülal quruluşlarının yoxlanılmasında əhəmiyyətli vasitədir. Aşırı kəskinləşdirmə yaxud da yayılma hallarının mümkünlüyü Temperatur faktorunun mütləq qiymətini mənasız edir. B faktorun mütləq qiyməti əvəzinə, onun paylanmasının istifadə edilməsi daha məqsədəuyğundur. Nadir hallarda, bəzi quruluşlar üçün temperatur faktorunun statistik paylanması Sürüşən tərs qamma paylanmasına uyğun gəlməyə bilər. Bu onu göstərir ki, belə quruluş modeli daha dərindən analiz edilməlidir. B faktorun paylanmasının Tərs qammaya uyğun gəlməməsinin bir neçə səbəbi ola bilər. Bunlardan, çox yüksək aşırı-kəskinləşdirmə və ya bulanıqlılıq, bəzi quruluşlar üçün isə tvinninq halları, həmçinin, saflaşdırma zamanı qeyri-kristalloqrafik simmetriya hissəsində məhdudlaşdırmaların (sərt, qlobal, lokal) düzgün seçilməməsi ola bilər. Ümumilikdə isə B faktorun belə modelləşdirilməsi ZVB-dəki quruluşlar üçün özünü doğruldur. Temperatur faktorunun statistik paylanmasının parametrlənməsi saflaşdırmadan əvvəl aşırı kəskinləşdirmə yaxud da yayılmanın olmasını müəyyən etməyə imkan verir. Gələcəkdə Temperatur faktorunun paylanmasının aşağı ayırdetməli quruluşların saflaşdırılmasına tətbiq edilməsi mümkündür. Bu metod, saflaşdırmadan öncə kəskinləşdirmə dərəcəsinin düzgün təyin edilməsi üçün xüsusilə əhəmiyyətli ola bilər. Temperatur faktorunun ayırdetmə ilə əlaqəli nəzərdən keçirilməsi həmişə yaxsı ideyadır. Gələcək tədqiqatlar həmçinin B faktorun qiyməti və ayırdetmədən asılı olaraq, nöqtəvi atomun ətrafında elektron buludunun hündürlüyündən (Masmaliyeva and Murshudov, 2019) istifadə etməklə, B faktorunun qiyməti öz yaxın ətrafından kəskin fərqlənən yanlış modelləşdirilmiş atomların müəyyənləşdirilməsinə istiqamətlənmiş alqoritmin inkişaf etdirilməsinə həsr ediləcəkdir.

## MİNNƏTDARLIQ

Tədqiqat işi Azərbaycan Milli Elmlər Akademiyası Rəyasət Heyətinin 5/9 nömrəli qərarı əsasında maliyyələşən qrant layihəsi çərçivəsində həyata keçirilmişdir.

## ƏDƏBİYYAT

**Berman H.M., Battistuz T., Bhat T.N., Bluhm W.F., Bourne P.E., Burkhardt K., Feng Z., Gilliland G.L., Iype L., Jain S., Fagan P., Marvin J., Padilla D., Ravichandran V., Schneider B., Thanki N., Weissig H., Westbrook J.D., Zardecki C.** (2002) The Protein Data Bank. *Acta Cryst.,* **D58:** 899-907.

**Carugo O.** (2018) How large B-factors can be in protein crystal structures. *BMC bioinformatics,* **19(1):** 61.

**Dauter Z., Murshudov G.N., Wilson K.S.** (2006) International Tables for Crystallography. **Vol. F:** 393-402. *Chester: International Union of Crystallography.*

**Grosse-Kunstleve, R.W., Adams P.D.** (2002) On the handling of atomic anisotropic displacement parameters. *J. Appl. Cryst.,* **35:** 477-480.

**Hible G., Christova P., Renault L., Andrew E.S., Girard T.E., Munier-Lehmann H., Cherfils J.** (2005) Unique GMP-binding site in *Mycobacterium tuberculosis* guanosine monophosphate kinase. *Proteins,* **62(2):** 489-500

**Jones E., Oliphant E., Peterson P., et al.** (2019) *SciPy: Open Source Scientific Tools for Python, 2001; http://www.scipy.org/*

**Read R.J., Adams P.D., Arendall W.B. 3rd, Brunger A.T., Emsley P., Joosten R.P., Kleywegt G.J., Krissinel E.B., Lütteke T., Otwinowski Z., Perrakis A., Richardson J., Sheffler W., Smith J., Tickle I., Vriend G., Zwart P.** (2011) A new generation of crystallographic validation tools for the protein data bank. *Structure,* **19:** 1395–1412.

**Masmaliyeva R., Murshudov G.N.** (2017) Refinement and validation of macromolecular structures. *Transactions of the Institute of Molecular Biology & Biotechnologies of ANAS,* **1:** 80-93.

**Masmaliyeva R., Murshudov G.N.** (2018) Outlier detection in atomic temperature factor - B value distribution. *Proceedings of ANAS (Biological and Medical Sciences),* **73(2):** 25-32.

**Masmaliyeva R.C., Murshudov G.N.** (2019) Analysis and validation of macromolecular B values. *Acta Cryst.,* **D75:** 505-518.

**Merritt E.A.** (2011) Some Beq are more equivalent than others. *Acta Cryst.,* **A67:** 512–516.

**McGill R., Tukey John W., Larsen Wayne A.** (1978) Variations of box plots. *The American Statistician.,* **32(1):** 12–16.

**Morris A.L., MacArthur M.W., Hutchinson E.G., Thornton J.M.** (1992) Stereochemical quality of protein structure coordinates. *Proteins,* **12 (4):** 345–64.

**Murshudov G.N., Skubák P., Lebedev A.A., Pannu N.S., Steiner R.A., Nicholls R.A., Winn M.D., Long F., Vagin A.A.** (2011) REFMAC5 for the refinement of macromolecular crystal structures. *Acta Cryst.,* **D67:** 355–367.

**Pizarro J.C., Chitarra V., Verger D., Holm I., Petres S., Dartville S., Nato F., Longacre S., Bentley G.A.** (2003) Crystal structure of a Fab complex whith Plasmodium falciparum MSP1-19.J. Mol.Biol., **328:** 1091.

**R Core Team** (2014) R: A Language and Environment for Statistical Computing. Vienna: R Foundation for Statistical Computing. *http://www.R-project.org.*

**Read R.J., Adams P.D., Arendall W.B., Brunger A.T., Emsley P., Joosten R.P., Kleywegt G.J., Krissinel E.B., Lütteke T., Otwinowski Z., Perrakis A., Richardson J.S., Sheffler W.H., Smith J.L., Tickle I.J., Vriend G., Zwart P.H.** (2011) A new generation of crystallographic validation tools for the protein data bank. *Structure,* **12; 19(10):**1395-412.

**Schneider B., Gelly J.C., de Brevern A.G., Černý J.** (2014) Local dynamics of proteins and DNA evaluated from crystallographic B factors. *Acta Cryst., Section D, Biological crystallography,* **70(Pt 9):** 2413–2419.

**Stuart A., Ord K., Arnold S.** (1999) Kendall's Advanced Theory of Statistics, ***2A.*** *London: Edward Arnold.*

**Trueblood K.N., Burgi H.-B., Burzlaff H., Dunitz J.D., Gramaccioli C.M., Schulz H.H., Shmueli U., Abrahams S.C.** (1996) Atomic Dispacement Parameter Nomenclature. Report of a Subcommittee on Atomic Displacement Parameter Nomenclature. *Acta Cryst.,* **A52: 770-781.**

**Tukey J.W.** (1977). Exploratory data analysis. *Addison-Wesley Series in Behavioral Science - Quantitative Methods,* 711.

## Анализ структур Базы Данных Белков с использованием параметров смещения атомов

**Р.Ч. Масмалиева**

*Институт молекулярной биологии и биотехнологий НАН Азербайджана,*
*Баку, Азербайджан*

В настоящее время в Базе Данных Белков (БДБ) имеется более 156 000 макромолекулярных структур. Если на первых этапах развития структурной биологии приоритетной задачей являлось получение как можно большего числа структур, то в настоящее время основная задача заключается, в разъяснении сути различных биологических процессов путем целенаправленного изучения строения молекул. В связи с этим проверка и уточнение трехмерных макромолекулярных структур приобретает все более важное значение, т.е. необходима разработка новых программ проверки. Классические методы валидации основаны на физических и химических особенностях макромолекул, а также на геометрии аминокислот. В наших исследованиях мы описываем метод проверки, основанные на использования параметров смещения атома (ПСА). ПСА иллюстрирует отклонение атома от

его основного положения. Разработанный метод статистического анализа распределения ПСА может быть использован в качестве эффективного инструмента валидации. Данная статья посвящена применению статистического анализа ПСА к ББД и возможному использованию этих методов для макромолекулярной валидации.

***Ключевые слова:*** *Параметры смещения атома, макромолекулярное уточнение, валидация*

**Analysis of structures from Protein Data Bank using atom displacement parameters**

**R.C. Masmaliyeva**

*Institute of Molecular Biology and Biotechnologies, Azerbaijan National Academy of Sciences, Baku, Azerbaijan*

Currently there are more than 156,000 macromolecular structures in Protein Data Bank (PDB). If at first times of development of Structural biology the priority purpose was solving as many structures as possible, currently the main purpose is solving structures, which allow understanding different biological processes. This is why validation and refinement of macromolecular structures become more and more important. New validation tools need to be developed. Classic methods of validation are based on physical and chemical features of macromolecules, as well as the geometry of amino acids. In our researches, we describe a method of validation by using Atom Displacement Parameters (ADP). ADP illustrates the variation of atom from its main position. Development of the method of statistical analysis of ADP distribution may be used as an effective validation tool. This contribution is devoted to application of statistical analysis of ADPs to PDB and possible use of this method for macromolecular validation.

***Keywords:*** *Atom displacement parameters, macromolecular refinement, validation*

*Həyat elmləri və biotibb jurnalı, cild 74, №2, səh. 13-19 (2019)*

# Создание бактериальной коллекции на основе штаммов, изолированных из почв Азербайджана и их скрининг на наличие новых антибактериальных биомолекул

**А.Г. Агаева**

*Институт молекулярной биологии и биотехнологий НАН Азербайджана, Иззат Набиев, 11, Баку AZ1122, Азербайджан; E-mail: aytanaghayeva@gmail.com*;
Принято к печати: 20.12. 2019

**Основной целью исследовательской работы, проведенной в период с 2014 по 2018 годы, было создание бактериальной коллекции, которая включает новые, ранее некультивируемые штаммы, изолированные из почв Азербайджана и их антибактериальный скрининг. 30 образцов почв были собраны из разных зон Азербайджана и отправлены в Фраунхоферский центр молекулярной биотехнологии (США) для бактериальной изоляции и скрининга. Из 30 образцов почв было выделено 578 штаммов и создана новая бактериальная коллекция. Все 578 изолированных бактерий были проанализированы на антибактериальную активность против двух грамположительных (*Staphylococcus aureus, Enterococcus faecalis*) и двух грамотрицательных (*Escherichia coli)* патогенных штаммов методом подавления роста. 62 изолята продуцировали соединение, обладающее антибактериальной активностью по меньшей мере против одного патогенного индикатор-организма. Из 62 изолят 14 показали активность в супернатанте.**

***Ключевые слова:*** *Антибактериальные агенты, антимикробная активность, изоляция бактерий, патогенные бактерии, грамположительные бактерии, грамотрицательные бактерии*

## ВВЕДЕНИЕ

Микроорганизмы являются самой древней формой жизни на Земле, они существуют миллиарды лет и успешно адаптируются к постоянно меняющимся условиям окружающей среды (Zengler, 2009; Kumar et al., 2017). Разнообразие микроорганизмов так же велико, как оно неизвестно (Vitorino et al., 2018). Микроорганизмы играют важнейшую роль в круговороте веществ и в поддержании динамического равновесия в биосфере Земли. Кроме того, микроорганизмы продуцируют целый ряд полезных органических соединений - аминокислот, белков, антибиотиков, липидов, витаминов, ферментов, пигментов, нуклеиновых кислот, которые широко используются в разных областях промышленности и в медицине (Singh et al., 2017; Raveendran et al., 2018; Singh et al., 2016; Matassa et al., 2016). Предполагается, что в настоящее время идентифицировано менее одного процента от огромного разнообразия микроорганизмов (Wade, 2002; Kellenberger, 2001). Все известные микробные биомолекулы, полезные для человека в качестве лекарств, биотоплива и т. д., были продуцированы только 1% идентифицированных видов микроорганизмов.

Начиная с 1928 года – с года открытия пенициллина (Jones et al., 2017) - и по сегодняшний день основным оружием для борьбы с патогенными микроорганизмами являются антибиотики. Однако, в последние годы растет число устойчивых к антибиотикам бактерий, антибиотики постепенно теряют свою эффективность и это становится серьезной проблемой для здоровья (Ventola, 2015; Prestinaci et al., 2015). Каждый год в США около 90 000 пациентов заражаются и умирают от устойчивых к лекарствам бактерий. Для инфекций, вызванных метициллин-резистентным *Staphylococcus aureus* (MRSA) и устойчивым ко многим лекарствам (MDR) *Acinetobacter baumannii*, для лечения доступно меньше ан-

тибиотиков, чем 10 лет назад (Okwu et al, 2019; Manchanda et al., 2010; van Duin et al., 2016). Для многих других инфекций выбор антибиотиков быстро уменьшается. Например, для патогенных микроорганизмов, несущих плазмиду с геном New Delhi metallo-beta-lactamase-1 (NDM-1), практически нет выбора для антибиотикотерапии, поскольку NDM-1 вызывает устойчивость почти ко всем антибиотикам, имеющимся на рынке и на стадии разработки (Raghunath, 2010; Fomda et al., 2014). Изначально ген NDM-1 был идентифицирован в *Escherichia coli* и *Klebsiella pneumoniae*, но он обладает способностью быстро переноситься между бактериями посредством горизонтального трансфера генов (Khan et al., 2017; Johnning et al., 2018).

С другой стороны, так как большинство используемых сегодня в клинике антибиотиков были выделены из живых организмов или представляют собой модифицированные соединения, структура которых получена из натуральных продуктов (Jones et al., 2017), крупные компании со всего мира вкладывают огромные деньги для открытия и идентификации новых антибиотиков.

Учитывая критическую важность разработки новых антибиотиков, основной идеей и общей концепцией данной работы является создание коллекции микроорганизмов, в состав которой входят новые, ранее некультивируемые штаммы бактерий и их антибактериальный скрининг. Для реализации поставленной цели, мы решили изолировать бактерии из микробиоты Азербайджана. В литературе очень мало информации об антимикробной активности бактерий, изолированных из богатых почв Азербайджана, и это сильно увеличивает наши шансы на обнаружение нового штамма бактерий с полезными свойствами.

## МАТЕРИАЛ И МЕТОДЫ

Объектами исследования служили 30 образцов почв, собранные в течение 2014–2018 годов из разных зон Азербайджана. Образцы почв, с глубины 5-10 см, собирали в отдельные стерильные полипропиленовые пакеты с использованием шпателя, которую стерилизовали в 100 % этаноле и промывали стерильной дистиллированной водой между образцами. Все собранные образцы были отправлены во Фраунхоферский центр молекулярной биотехнологии (США) для дальнейшего анализа.

Изоляцию бактерий осуществляли по методу стандартного серийного разведения. Чтобы осадить частицы почвы, примерно 1 грамм каждого образца почвы суспендировали в стерильном однократном натрий-фосфатном буфере, тщательно перемешивали и инкубировали в течение 2 часов при комнатной температуре. Через 2 часа, образцы были серийно разведены в соотношении 1:10 в стерильном однократном натрий-фосфатном буфере в диапазоне от $10^{-1}$ до $10^{-3}$. Для изоляции бактерий, 100 мкл неразведенного и серийно (1/10, 1/100 и 1/1000) разведенных образцов почвенной суспензии высевали на чашки Петри с триптическим соевым агаром (TSA) и инкубировали в течение 1-3 дней при 32 °С. Чашки Петри рассматривали ежедневно. Все колонии с разной морфологией переносили на свежую питательную среду (TSA) и очищали. На основе изолированных бактерий была создана бактериальная коллекция, в которой колонии отличались друг от друга морфологическими характеристиками (форма колонии, рельеф, характер поверхности, прозрачность, цвет, хромогенез, размер, консистенция). Все колонии в коллекции считались неизвестными бактериями, и хранились в 15 % глицерине при -80 °С.

На следующей стадии все изолированные штаммы бактерий были подвергнуты скринингу на их антибактериальную активность против двух грамположительных (*Staphylococcus aureus*, *Enterococcus faecalis*) и двух грамотрицательных *Escherichia coli* (эталонный (DC0) и мутант проницаемости наружной мембраны (DC2)) патогенных штаммов - индикаторов методом подавления роста, как описано Hockett с некоторыми модификациями. Скрининг проводили путем добавления суспензии культуры неизвестных изолятов на чашку Петри с агаром, конфлюирующим со штамм – индикаторами (Balouiri et al., 2016; Hockett et al., 2017). Чашки были инкубированы при 37 °С на 20 часов. Изоляты с антибактериальной активностью были идентифицированы по наличию зоны подавления роста вокруг того места, где была добавлена суспензия. Диапа-

зон антибактериальной активности, выраженной в миллиметрах, оценивали путем измерения прозрачной зоны от края тестируемой колонии до края роста индикатор-организма. Зону подавления роста меньше 1 мм характеризовали как слабую, больше 1 мм как сильную активность. После первичного тестирования, штаммы, которые продемонстрировали антибактериальную активность, по меньшей мере против одного индикатора, были отобраны для дальнейшего исследования. Все изоляты с антибактериальной активностью были подвергнуты скринингу на наличие ингибирующей активности в супернатанте, чтобы определить, секретирует ли бактерия активное антибактериальное соединение в супернатант клеточной культуры. Скрининг проводили методом подавления роста (Balouiri et al., 2016; Hockett et al., 2017). Изоляты инокулировали в питательную среду (триптический соевый бульон - TSB) и выращивали при 32°C и 180 об/мин. После 24-часовой инкубации супернатанты собирали, центрифугировали при 10000 g в течение 15 минут при 4°C и фильтровали через 0,22 µm PES-мембрану. Культура и супернатант изолятов были нанесены на чашки Петри с агаром, конфлюирующим со штамм - индикатором, против которого изолят был активен. Чашки инкубировали при 37°C и измеряли диаметр зоны подавления роста.

## РЕЗУЛЬТАТЫ И ОБСУЖДЕНИЕ

Из 30 собранных образцов почвы было выделено 578 аэробных бактериальных культур, и создана бактериальная коллекция. После создания, все изоляты коллекции могут быть проверены на антимикробную активность, а также на наличие других ценных соединений. Наши первоначальные исследования были сосредоточены на антибактериальном скрининге против 4 патогенных индикаторных организмов с использованием метода подавления роста (Рис. 1).

После первоначального скрининга 62 изолята продемонстрировали антибактериальную активность по крайней мере против одного индикатор-организма. 35 из них обладали грамположительной, 13 – грамотрицательной и 14 как грамположительной, так и грамотрицательной активностями. Все 62 изолята были идентифицированы как «интересующие изолята» и отобраны для дальнейшей характеристики.

Дальнейшие эксперименты были сосредоточены на тестировании «интересующих изолят» на ингибирующую активность в супернатанте. Скрининг по-прежнему осуществлялся методом подавления роста штамма-индикатора, против которого изолят был активен (Рис. 2).

Из 62 проанализированных изолят 14 продемонстрировали активность в супернатанте и были идентифицированы как «наиболее перспективные изоляты».

Создание бактериальной коллекции с широким разнообразием видов имеет очень важное значение для выявления новых биомолекул с ценными фармацевтическими и промышленными свойствами. Наши шансы на обнаружение новых биомолекул сильно возрастают, если в состав созданной коллекции входят новые, ранее неизвестные штаммы микроорганизмов. Учитывая, что в литературе очень мало информации об антимикробной активности бактерий, изолированных из богатых почв Азербайджана, наши шансы на обнаружение нового штамма бактерий с полезными свойствами сильно возрастают.

В результате проведенных экспериментов создана бактериальная коллекция, состоящая из 578 микроорганизмов. В данной работе представлены результаты антибактериального скрининга. В дальнейшем, расширяя диапазон экпериментов, можно осуществить скрининг созданной коллекции на наличие в ней штаммов с противогрибковыми, противораковыми, противопаразитическими и др. активностями. По результатам антибактериального скрининга 14 изолят показали активность против тестируемого патогенного индикатор-организма. На этой стадии все 14 изолят рассматриваются как потенциальный продуцент новых биомолекул. Дальнейший анализ выбранных микроорганизмов будет включать их идентификацию путем секвенирования 16S rRNA гена, выделение/очистку секретируемых биоактивных соединений из бесклеточного культурального супернатанта, определение химической структуры биомолекулы и подтверждение антимикробной активности *in vivo*.




**Рис. 1.** ***Антибактериальный скрининг.*** А) Изоляты AZ-307, AZ-309 и AZ-380 показывают соответственно слабую, слабую и ~2 мм зону подавления роста против *S.aureus;* Б) Изоляты AZ-307, AZ-309 и AZ-380 показывают слабую, а AZ-367 – 1 мм активность против *E.faecalis*; В) Г) Изоляты AZ-309 и AZ-380 показывают слабую активность против *E.coli* DC0 и *E.coli* DC2.




**Рис. 2.** ***Скрининг супернатанта.*** А) Супернатанты AZ-130 и AZ-195 соответственно показывают ~4 мм и ~8 мм зону подавления роста, в то время как, культура этих же самых изолят показали лишь слабую активность против *S.aureus*. Б) Супернатанты AZ-289 и AZ-302 показали слабую активность, в то время как, культура этих же самых изолят показали активность в 2 мм против *S.aureus;* AZ-307 показывает активность в 1 мм в культуре, но нет никакой активности в супернатанте против *S.aureus*. В) Супернатанты AZ-130 и AZ-195 соответственно показывают ~7 мм и ~8 мм зону подавления роста, в то время как, культура этих же самых изолят показали лишь слабую активность против *E.faecalis*. Г) AZ-380 показывает слабую активность в культуре против *E.coli*. Но в супернатанте нет никакой активности

Дальнейший анализ выбранных микроорганизмов будет включать их идентификацию путем секвенирования 16S rRNA гена, выделение/очистку секретируемых биоактивных соединений из бесклеточного культурального супернатанта, определение химической структуры биомолекулы и подтверждение антимикробной активности *in vivo*.

## ПРИЗНАТЕЛЬНОСТЬ

Автор статьи выражает благодарность и глубокую признательность академику И.М.Гусейновой, профессору В.М.Юсибову (научно-исследовательский институт биологических наук Индианы, США), профессорам S.J.Streatfield и J.Karczewski (Фраунхоферский центр молекулярной биотехнологии, США), профессору S.Goldman (Evolva, Калифорния, США) и C.M.Morris (Hygiena/Qualicon Diagnostics LLC, Делавер, США) за советы и ценные замечания при работе над данной статьей.

## ЛИТЕРАТУРА

**Balouiri M., Sadiki M., Ibnsouda S.K.** (2016) Methods for in vitro evaluating antimicrobial activity: A review. *J. Pharm. Anal.*, **6(2):** 71-79.

**Fomda B.A., Khan A., Zahoor D.** (2014) NDM-1 (New Delhi metallo beta lactamase-1) producing Gram-negative bacilli: Emergence & clinical implications. *Indian J. Med. Res.*, **140(5):** 672-678.

**Hockett K.L., Baltrus D.A.** (2017) Use of the soft-agar overlay technique to screen for bacterially produced inhibitory compounds. J. Vis. Exp., **119:** 55064.

**Johnning A., Karami N., Hallbäck T.E., Müller Vilhelm., Nyberg L., Buongermino P.M., Stewart C., Ambjörnsson T., Westerlund F., Adlerberth I. and Kristiansson E.** (2018) The resistomes of six carbapenem-resistant pathogens – a critical genotype–phenotype analysis. *Microb. Genom.*, **4(11):** doi: 10.1099/mgen.0.000233.

**Jones M.B., Nierman W.C., Shan Y., Frank B.C., Spoering A., Ling L., Peoples A., Zullo A., Lewis K., Nelson K.E.** (2017) Reducing the bottleneck in discovery of novel antibiotics. *Microbial Ecology,* **73(3):** 658-667.

**Kellenberger E.** (2001) Exploring the unknown. The silent revolution of microbiology. *EMBO reports*, **2(1):** 5–7.

**Khan A.U., Maryam L., Zarrilli R.** (2017) Structure, genetics and worldwide spread of New Delhi Metallo-β-lactamase (NDM): a threat to public health. *BMC Microbiol.*, **17:** 101.

**Kumar A., Chordia N.** (2017) Role of microbes in human health. *Applied Microbiology: Open Access*. **3:** 2.

**Manchanda V., Sanchaita S., Singh N.P.** (2010) Multidrug resistant acinetobacter. *J. Glob. Infect. Dis.*, **2(3):** 291-304.

**Matassa S., Boon N., Pikaar I., Verstraete W.** (2016) Microbial protein: future sustainable food supply route with low environmental footprint. *Microb. Biotechnol.*, **9(5):** 568–575.

**Okwu M.U., Olley M., Akpoka A.O., Izevbuwa O.E.** (2019) Methicillin-resistant *Staphylococcus aureus* (MRSA) and anti-MRSA activities of extracts of some medicinal plants: A brief review. *AIMS Microbiology*, **5(2):** 117–137.

**Prestinaci F., Pezzotti P., Pantosti A.** (2015) Antimicrobial resistance: a global multifaceted phenomenon. *Pathog. Glob. Health*, **109(7):** 309–318.

**Raghunath D.** (2010) New metallo β-lactamase NDM-1. *Indian J. Med. Res.*, **132(5):** 478–481.

**Raveendran S., Parameswaran B., Ummalyma S.B., Abraham A., Mathew A.K., Madhavan A., Rebello S., Pandey A.** (2018) Applications of microbial enzymes in food industry. *Food Technol. Biotechnol.*, **56(1):** 16–30.

**Singh R., Kumar M., Mittal A., Mehta P.K.** (2016) Microbial enzymes: industrial progress in 21st century. *3 Biotech.*, **6(2):** 174.

**Singh R., Kumar M., Mittal A., Mehta PK.** (2017) Microbial metabolites in nutrition, healthcare and agriculture. *3 Biotech*., **7(1):** 15.

**van Duin D., Paterson D.L.** (2016) Multidrug resistant bacteria in the community: Trends and lessons learned. *Infect. Dis. Clin. North. Am.*, **30(2):** 377–390.

**Ventola C.L.** (2015) The antibiotic resistance crisis. Part 1: Causes and threats. *Pharmacy and Therapeutics*, **40(4):** 277–283.

**Vitorino L.C., Bessa L.A.** (2018) Microbial diversity: The gap between the estimated and the known. *Diversity*, **10(2):** 46

**Wade W.** (2002) Unculturable bacteria - the uncharacterized organisms that cause oral infections. *J. R. Soc. Med.*, **95(2):** 81–83.

**Zengler K.** (2009) Central role of the cell in microbial ecology. *Microbiology and Molecular Biology Reviews*, **73(4):** 712–729.

## Azərbaycan torpaqlarından ayrılmış ştamlar əsasında bakteriya kolleksiyasının yaradılması və onların yeni antibakterial biomolekulların mövcudluğuna görə skrininqi

**A.Q. Ağayeva**

*AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu, Bakı, Azərbaycan*

2014-2018 illər ərzində aparılmış tədqiqat işinin əsas məqsədi tərkibinə Azərbaycan torpaqlarından ayrılmış yeni, əvvəllər becərilməmiş kulturalar daxil olan bakteriya kitabxanasının yaradılması və kulturaların antibakterial skrininqinin aparılması olmuşdur. Bu məqsədlə, 30 torpaq nümunələri Azərbaycanın müxtəlif bölgələrindən toplanmış və bakteriyaların ayrılması və skrininq edilməsi üçün ABŞ-ın Fraunhofer Molekulyar Biotexnologiya Mərkəzinə göndərilmişdir. Həmin torpaq nümunələrindən 578 bakteriya kulturası ayrılmış və yeni bakteriya kitabxanası yaradılmışdır. Kitabxanaya daxil olan 578 ştamların antibakterial fəallıqları 2 qram-müsbət (*Staphylococcus aureus*, *Enterococcus faecalis*) və 2 qram-mənfi (*Escherichia coli*) patogen mikroorganizmlərə qarşı yoxlanılmışdır. Skrininq nəticəsində 62 ştam ən azı bir patogen orqanizmə qarşı antibakterial aktivlik göstərmişdir. Analiz edilmiş 62 bakteriya kulturasının 14-nün supernatantında antimikrob fəallıq müəyyən edilmişdir.

***Açar sözlər:*** *Antibakterial agentlər, antimikrob fəallıq, bakteriyaların ayrılması, patogen bakteriyalar, qram-mənfi bakteriyalar, qram-müsbət bakteriyalar*

## Creation of a bacterial library based on strains isolated from soil of Azerbaijan and their screening for the presence of new antibacterial biomolecules

**A.G. Aghayeva**

*Institute of Molecular Biology and Biotechnologies, Azerbaijan National Academy of Sciences, Baku, Azerbaijan*

The major goal of the research project carried out during the years 2014 - 2018 was to establish a library of microorganisms, including novel, previously uncultured bacterial species, isolated from soil of Azerbaijan, and their antibacterial screening. For this, 30 soil samples were collected from different zones of Azerbaijan and sent to the Fraunhofer USA Center for Molecular Biotechnology for bacterial isolation and screening. 578 bacterial strains were isolated from 30 soil samples and a new bacterial library was created. All 578 isolated strains were analyzed for antibacterial activity against two gram-positive (*Staphylococcus aureus*, *Enterococcus faecalis*) and two gram-negative (*Escherichia coli*) pathogenic strains by growth inhibition assay. 62 isolates showed an antibacterial activity against at least one pathogenic indicator organism. After supernatant screening, 14 isolates showed an inhibitory activity in cell-free culture supernatant.

***Keywords*:** *Antibacterial agent, antimicrobial activity, bacterial isolation, pathogenic bacteria, gram-negative bacteria, gram-positive bacteria*

*Həyat elmləri və biotibb jurnalı, cild 74, №2, səh. 20-27 (2019)*

# Azərbaycan florasında *Tanacetum* L. (*Asteraceae*) cinsi haqqında

**S.C. Mustafayeva*, T.A. Qasımova, Z.S. Əliyeva**

*AMEA Botanika İnstitutu, Badamdar yolu, 40, Bakı AZ1004, Azərbaycan; *E- mail: msitara@mail.ru*
Çapa qəbul edilmişdir: 27.09.2019

**Məqalədə *Tanacetum* L. və *Pyrethrum* Zinn. cinslərində baş verən dəyişikliklərdən, onların əvvəlki və müasir vəziyyətindən bəhs edilir. Müəyyən edilmişdir ki, *Pyrethrum* cinsinin növləri bütünlüklə *Tanacetum* cinsinin tərkibinə keçmiş və hal-hazırda *Tanacetum* cinsi Azərbaycan florasında 2 seksiyaya aid 27 növlə təmsil olunur. Növlərin yeni təyinedici açarı tərtib olunmuş və onların qısa icmalı verilmişdir.**

***Açar sözlər:*** *Tanacetum, Pyrethrum, növlər, təyinat açarı*

Dünya florasında *Tanacetum* L. (*Asteraceae*) cinsinin Avropa, Asiya, Şımali Afrika və Şimali Amerikada yayılmış 167 növü məlumdur. *Tanacetum* geniş cins olmağına baxmayaraq, tamamilə sabit cins deyil. Belə ki, çox vaxt onun tərkibinə *Pyrethrum, Chrysanthemum, Achillea* cinslərinin növlərini daxil etmişlər.

Məlumdur ki, hələ çox əvvəllər Dekandol (De Candolle) və Kassini (Cassini) mürəkkəbçiçəklilərin taksonomiyasında karpoloji əlamətlərə çox böyük əhəmiyyət vermişlər. XX əsrin əvvəllərində P.Lavial (Lavialle, 1912) və J.Brike (Briquet 1916, 1930) də sistematikada toxumcaların anatomiyasının öyrənilməsinin əhəmiyyətini qeyd etmişlər. J. Brike (Briquet 1916, 1930) *Pyrethrum* cinsini sərbəst cins kimi qəbul etməyərək onu yığma cins kimi qiymətləndirmiş və belə bir cinsin olmadığını demişdir. İlk dəfə olaraq *Pyrethrum* və *Tanacetum* cinslərini toxumcalarının quruluşuna görə birləşdirən K.G.Şults (Schultz, 1844) olmuşdur. Aparılmış anatomik tədqiqatlar da *Pyrethrum* və *Tanacetum* cinslərinin yaxınlığını sübut etmiş (Briquet, 1916; Giroux, 1930; Kynclová , 1970; Бойко, 2002; Reitbrecht, 2002) və bir daha K. G. Şultsun (Schultz, 1844) hər iki cinsin *Tanacetum* cinsində birləşdirilməsi fikrinin düzgünlüyünü təsdiqləmişdir.

Deyilənlərə baxmayaraq, XX əsrdə əksər fundamental ədəbiyyat mənbələrində *Pyrethrum* və *Tanacetum* cinsləri ayrı-ayrı verilmişdir (Растительные ресурсы СССР, 1993; Флора Азербайджана, 1961, Флора СССР, 1961; Черепанов, 1995).

"Флора Азербайджана" kitabının VIII cildində R.M.Sofiyeva *Tanacetum* cinsinin 4 növünün, İ.P.Mandenova isə *Pyrethrum* cinsinin 28 növünün təsvirini vermişdir (Флора Азербайджана, 1961). Son illərin ədəbiyyat məlumatlarına görə (Конспект флоры Кавказа, 2008; Əsgərov, 2016) isə *Pyrethrum* cinsinin növləri bütünlüklə *Tanacetum* cinsinin tərkibinə keçmiş, bir çox növlərin adı dəyişmiş və bəziləri sinonimə keçmişdir (cədvəl).

Beləliklə, ədəbiyyat mənbələri nəzərə alınmaqla AMEA Botanika İnstitutunun "Herbari" fondu araşdırılmış və bizim tərəfimizdən Azərbaycanın müxtəlif bölgələrindən yığılmış növlər təyin olunduqdan sonra müəyyən olunmuşdur ki, *Tanacetum* (=*Pyrethrum*) cinsi floramızda 27 növlə təmsil olunur.

Aşagıda *Tanacetum* cinsi növlərinin yeni təyinedici açarı, onların qısa icmalı, yayılması, nomenklatur və coğrafi tipləri (A.A.Qrossheym, 1936 və N.N. Porteniyer, 2012) verilmişdir.

1. Kənar çiçəkləri dilcikvari, ortadakı çiçəkləri boruvaridir ........................................................ 2
- Bütün çiçəkləri boruvaridir .......................... 22
2. Toxumcaların qabırğaları (5-10) bərabər paylanmışdır ...................................................... 3
- Toxumcaların qabırğaları qarıncıq hissədə 3 qabırğacıqla yaxınlaşmışdır ..... 25. *T. Silaifolium*
3. Yarpaq ayaları çox və ya az ləlєkvari bölünmüşdür...................................................... 5
- Yarpaq ayaları tam, kənarları çox və ya az dişli, uzunsovdan enli ovala qədərdir .......................... 4

